


# PEDAQOJİ UNİVERSİTETİN XƏBƏRLƏRİ

# ИЗВЕСТИЯ ПЕДАГОГИЧЕСКОГО УНИВЕРСИТЕТА

# TRANSACTIONS OF PEDAQOGICAL UNIVERSITY

***Humanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası***

***Серия гуманитарных, общественных и педагогико-психологических наук***

***Series of humanitarian, social and pedagogical-psychological sciences***

**2016 2**

# PEDAQOJİ UNİVERSİTETİN
# XƏBƏRLƏRİ

# ИЗВЕСТИЯ
## ПЕДАГОГИЧЕСКОГО УНИВЕРСИТЕТА

# TRANSACTIONS
## OF PEDAQOGICAL UNIVERSITY

ISSN 2520-2014

***Humanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası***

***Серия гуманитарных, общественных и педагогико-психологических наук***

***Series of humanitarian, social and pedagogical-psychological sciences***

**2016, C. 64, № 2**

# MÜNDƏRİCAT

## Humanitar elmlər



## İctimai elmlər

## *Pedaqoji-psixoloji elmlər*

# СОДЕРЖАНИЕ

## *Гуманитарные науки*



## *Общественные науки*

## *Педагогико-психологические науки*

# TABLE OF CONTENTS

## *Humanitarian sciences*



## *Social sciences*

## *Pedagogical-psychological sciences*

PEDAQOJİ UNİVERSİTETİN XƏBƏRLƏRİ – 2016, C. 64, № 2
ИЗВЕСТИЯ ПЕДАГОГИЧЕСКОГО УНИВЕРСИТЕТА – 2016, Т. 64, № 2
TRANSACTIONS OF PEDAQOGICAL UNIVERSITY – 2016, V. 64, № 2

*E.R.Nəciyev*
*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutu*
*doktorant*
*elnurneciyev@gmail.com*

# SƏFƏVİLƏR DÖVLƏTİNDƏ ƏHALİNİN MİQRASİYASI

***Açar sözlər:*** *Səfəvilər, əhali miqrasiyası, tayfa, sürgün, köçürmə, məskunlaşdırılma*

Məqalədə müxtəlif tayfaların məskunlaşdırılması məsələsi diqqətdə saxlanılmaqla Səfəvilər dövlətindəki miqrasiyaların səbəbləri tədqiq olunmuşdur. Səfəvi hökmdarları müxtəlif səbəblərə görə ayrı-ayrı əhali qruplarının məskunlaşdırılması təcrübəsindən istifadə edirdilər. Xüsusilə də dövlətin sərhədlərini möhkəmləndirmək, sosial-iqtisadi rifahını təmin etmək üçün bu üsula əl atırdılar. Bəzi məskunlaşdırmalar idarə olunması çətin olan tayfaları zəiflətmək məqsədi daşımışdır. Məskunlaşdırmanın ən mühüm səbəbi isə fasiləsiz Osmanlı-Səfəvi müharibələri olmuşdur.

***Э.Р.Наджиев***

# МИГРАЦИЯ НАСЕЛЕНИЯ В ГОСУДАРСТВЕ СЕФЕВИДОВ

***Ключевые слова:*** *Сефевиды, миграция населения, племя, изгнание, расселение, переселения*

В этой статье рассматриваются причины миграции в государстве Сефевидов. Были приняты во внимание проблема расселения различных племён. Сефевидские правители по разным причинам использовали практику переселения различных групп населения, когда возникала необходимость укрепления границ, а также для обеспечения социально-экономического благополучия государства прибегали именно к этому методу. Некоторые переселения себя оправдывали как действенным методом для расслабления сил неуправляемых племен. А основной причиной переселения населения были продолжительные османо-сефевидские войны.

***E.R.Najiyev***

# HUMAN MIGRATION IN SAFAVID STATE

***Keywords:*** *Safavids, human migration, tribe, exile, emigration, resettlement, relocation*

In this article has been investigated the issues of resettling of the different tribes and also the reasons of migration in Safavid state. The Safavid rulers used the practice

of the various people groups resettlement due to different circumstances. Especially, they used these methods to strengthen borders and provide its socio-economic welfare as well. Some resettlement justified as an effective method to relax the uncontrollable forces of the tribes. And the main reason of resettlement was the continuous Ottoman–Safavid wars.

Əhali miqrasiyası köç edən insanların bu və ya digər ərazinin sərhədlərini keçərək yaşayış yerlərini daimi, qısa və ya uzun müddətə dəyişməsidir. Səfəvilər dövlətində əhalinin miqrasiyası ayrıca problem kimi sistemli şəkildə tədqiq olunmamışdır. Yazılan əsər və məqalələrdə [1; 2; 3; 4; 5; 8; 9; 13; 15; 19; 22; 23; 24; 26] ayrı-ayrı tayfaların imperiya daxilində könüllü, yaxud məcburi formada formada başqa-başa ərazilərdə məskunlaşdırılması məsələsinə əsasən mənfi formada münasibət bildirilmişdir. Xüsusilə də xristian əhalinin köçürülməsi diqqətdə saxlanılmaqla əhalinin böyük əksəriyyətini təşkil edən müsəlmanların öz yaşayış yerlərini tərk etmə səbəbləri əsasən məhdud formada araşdırılmışdır. Bu boşluğu aradan qaldırmaq üçün Səfəvilər dövlətində əhalinin miqrasiyasını baş vermə səbəblərinə görə qruplaşdırıb qismən də olsa tədqiq etməyə çalışdıq.

**Müharibənin səbəb olduğu köçlər.** Səfəvilər dövləti 1501-ci ildə yaranışından 1736-cı ildə süqutuna kimi demək olar ki, qonşuları ilə hərb şəraitində olmuşdur. Bu müharibələrin hər biri Səfəvilər dövlətinin əhalisinin taleyinə müəyyən qədər öz təsirini göstərmişdi. Xüsusilə də Osmanlılarla fasilələrlə bir əsrə yaxın davam edib 1639-cu il Qəsri-Şirin sülhü ilə başa çatan hərbi əməliyyatlar Səfəvilər dövlətinin iqtisadi həyatına daha ağır zərbələr vurmuş, xeyli insan itkisinə, məcburi əhali yerdəyişmələrinə səbəb olmuşdur. Osmanlıların hücum etdiyi yollar boyu əhali dövlətin içərilərinə doğru sürgün edilmiş, daşınmayan əmlakı isə həyat üçün zəruri olan bütün vasitələrlə birlikdə məhv edilmişdi. İlk dəfə olaraq bu taktikadan Şah I İsmayıl istifadə etmişdir. Onun Osmanlı hökmdarı Sultan I Səlimlə (1512-1520) hərbi əməliyyatların ilk mərhələsində Diyarbəkirdən çəkilərək yerli əhalini burdan köçürməklə daşınması mümkünsüz olan bütün maddi ehtiyatları məhv etməsi məlumdur. Bu barədə Osmanlı tarixçilərinin qeydləri vardır. Məsələn, Hoca Sadəddin Əfəndi yazırdı ki, "Şah İsmayılın Diyarbəkir valisi Məhəmməd xan Ustaclı geri çəkilən vaxt bölgənin əhalisini Səfəvi dövləti tərəflərinə köç etdirmiş və Osmanlı ordusunun keçəcəyi yolları yandırıb dağıtmaqla xarabalığa çevirmişdi. Bölgə viran olmuş və əkilən tikilən heç nə qalmamışdı. Kəndlər və qəsəbələr dağılmış, buğda, arpa və başqa zahirələr (ehtiyat üçün saxlanılan qida, əsasən taxıl – E.N.) tələf olmuşdu... Məhəmməd xan Ustaclu... şahına doğru qaçıb Azərbaycandan bu yana, adı çəkilən ərazi də daxil olmaqla əhalini köçürmüşdü" [11,183]. Əhalisi köçürülən ərazini İdris Bitlisi daha da dəqiqləşdirərək qeyd edir ki, "Tərcandan (Ərzincanda ərazi – E. N.) Xoy və Salmasa qədər heç bir bitki və heyvan izinə rast gəlinmirdi" [12, 162].

Köçürülən əhalinin sayı ilə bağlı daha dəqiq və ətraflı məlumat olmadığından Diyarbəkir vilayətindən Xoy və Salmasdan nə qədər əhalinin Azərbaycanın içərilərinə doğru köçürülməsi bəlli deyil. Bu cür məcburi köçlər yalnız hücum edən tərəfi ərzaqsız və ehtiyatsız buraxmaq məqsədi ilə həyata keçirilməmişdir. Köç həm də baş verən hər hansı bir müharibədə qalib tərəfin müraciət etdiyi ənənəvi bir üsul olmuşdur. Belə ki, Səfəvilər dövlətinin 1514-cü il Çaldıran döyüşündə Osmanlılara məğlub olmasından sonra Təbriz əhalisi-nin müəyyən qismi Osmanlı imperiyasına köçürüldü. Bu hadisə tarixdə 1514-cü il "Təbriz sürgünləri" adı ilə tanınır [9, 321-333]. Osmanlı Sultanı I Səlim (1512-1520) də 1514-cü ildə bir çox sənətkar ailəsini İstanbula köçürmüşdü. Bu sürgün barədə ayrıca nəşr etdirdiyimiz məqalədə geniş məlumat vermişdik [7, 82-89]. Qeyd edək ki, bu köçürülmə zamanı Təbrizdən İstanbula aparılan insanlarının sayı 200 nəfərdən çox deyildi [9, 325-333].

Əhali yerdəyişmələri Səfəvilər dövlətində Şah I Təhmasib (1524-1576) dövrün-də Osmanlılarla müharibə zamanı "yandırılmış torpaq siyasəti"nin tərkib hissəsi kimi təkrarən tətbiq olundu. Xüsusilə də, Osmanlı hökmdarı Sultan Süleymanın (1520-1566) ilk yürüşü zamanı, 1534-cü ildə Təbrizdə törətdiyi dağıntılardan sonra 1535-ci il yazın əvvəlində onun növbəti Təbrizə yürüşü ilə əlaqədar Şah I Təhmasib sakinləri Təbrizdən köçürmüş, şəhəri boşaltmışdı. Əhalini İraq və Farsa köçürmüşdü. Suvar-ma kanalları və kəhrizlər torpaqla doldurulmuşdu. Taxıl (qəllat) və əkinlər (məzruat) yandırılmış, yerdə qalan nə varsa, mal-qaraya yedizdirilmişdi. Şah qoşunları hətta hə-min ərəfədə Sultaniyyədən Dərəcəzinə gedən yolda da əkinləri yandırmışdı. Bu təd-birlər nəticəsində Osmanlı ordusu Sultaniyyə ərazisinə çatanda aclıq və baş verən ta-un xəstəliyinə görə canlı qüvvəsindən böyük tələfat vermişdi [3, 74]. Bu köçürülmələr zamanı Təbrizin əhalisinin sayı XVI əsrin əvvəllərində 200.000-300.000 nəfər təşkil edirdi. Osmanlılarla baş verən müharibələr vaxtı Səfəvilər dövlətinin içərilərinə doğru köçürülən Təbriz əhalisinin sayının nə qədər olması, etnik tərkibinin kimlərdən ibarət olması barədə hər hansı bir məlumat yoxdur. Lakin məlum olan odur ki, köçürülənlərin çoxu qısa müddətdən sonra yenidən öz doğma şəhərinə dönərək şəhəri yenidən abadlaşdırdılar [8, 159]. Lakin bu abadlaşma uzun çəkməmiş, xəstəliklər yayılmasına və xeyli insan tələfatına görə şəhər bir müddət tənəzzül dövrü yaşamışdır. İstər köçürülmələr, istərsə də Osmanlıların dağıdıcı yürüşləri (1534, 1535, 1548, 1555-ci illərdə) şəhərə birləşən yolları, əkin yerlərini, suvarma şəbəkələrini xarabalığa çevirmiş, şəhərin sənətkarlığının və ticarətin inkişafına ağır zərbə vurmuşdur [8, 154-155].

Təbriz şəhəri belə bir köçürülməni növbəti Səfəvi-Osmanlı müharibəsi (1578 -1590) zamanı yenidən yaşadı. İsgəndər Münşi yazır ki, "şəhərin (Təbrizin – E.N.) əhalisinin və sahibkarlarının köçürülüb darüssəltənə Qəzvinə tərəf aparılmasına və şanlı ordu əmirlərinin və əyanlarının dəvələr və ulaqlar

təmin etməklə bu işin həyata keçirilməsinə kömək etmələrinə dair ali əmr verildi. Yəqinlik sahibləri olan bir dəstə şəxs qəzavüqədər kimi cərəyan edən [hökmdar] fərmanına uyğun olaraq, əksər seçkin adamlar, sahibkarlar və əyanlarla birlikdə Qəzvinə yollandılar. Lakin, ortabab adamların çoxu şəhərin yaxın və uzağındakı yerlərə və mahallara pərakəndə oldular. Nəticədə o cür əzəmətli bir şəhər bir gecə-gündüz (gün – E.N.) ərzində elə boşaldıldı ki, "boş qalmış məkan" kəlməsinin məzmunundan savayı, heç bir diyarın vəziyyəti o cənnət misallı bağçanın halını anlatmaq üçün münasib olmadı" [6, 656]. Ümumiyyətlə, varlı təbəqə İsfahana, Qəzvinə, Qarabağa, ortabab və yoxsullar isə şəhərin ətraf mahalına köçürüldülər. Yüz binadan biri belə yaşayış üçün əlverişli deyildi. 1586-1603-cü illərdə Təbriz Osmanlı işğalı altında olduğu vaxtda şəhər ətrafına köçürülmüş yoxsulların bir hissəsi geriyə qayıdır. Həmin ərəfədə Təbriz əhalisinin sayı 300.000-400.000 nəfər idisə, bu köçlərlə S. Onullahiyə görə, 1603-cü ilə qədər cəmi 30.000 yaxın əhali qalmışdı [8, 160]. Əhali sayında bu azalmaya həm köç, həm də 1586-cı ildə Osman paşanın əmri ilə 20.000 nəfərin qətli səbəb olmuşdur. S.Onullahinin verdiyi rəqəm həqiqətə uyğundur, çünki Təbrizin demək olar ki, XVII əsrin I yarısının sonlarına qədər dağıntılar içində qalmasını dövrün mənbələri də təsdiqləyir [8, 160]. Lakin əvvəlki köçdə olduğu kimi bu köçdə də köçürülənləri sayı barədə dəqiq bir məlumat yoxdur. Şəhəri tərk etməyib Təbrizdə özünü, öz ailəsini qorumağa və şəhəri müdafiə etməyə qadir olan təqribən 50.000 gənc, qoçaq adam vardı. Onların ailələləri ilə şəhəri tərk etməyə razı olmadığını nəzərə alsaq şəhər əhalisinin yarıya qədərinin şəhərdə qaldığın deyə bilərik. 400.000 nəfərlik əhalinin görünür bir qismi, yəni 200.000 nəfəri köçürülmüşdü. Köçməyə razı olmayan və əsasən aşağı təbəqədən olan insanlar idi. Osmanlılar kişiləri öldürüb, qadın və uşaqları əsir və qul kimi apardılar. Lakin bu bəzən dəyişə də bilirdi, belə ki, Şərəfnamə müəllifinin yazdığına görə, "Təbriz xalqı məhəllələrin mühafizəsi üçün təyin edilən yeniçəri tayfasından olan bəzi nəfərləri öldürdü. Qapıqulu və yeniçəri ordusu da bu hadisəyə görə bunu Osman paşaya ərz etmədən şəhər və bazara basqın etdi. O an qoca, gənc və uşaqlardan ibarət təxminən 15.000 nəfər qılıncdan keçirildi və onların malları və ərzaqlarını yağmalanıb ailələrini də əsir olaraq qərargaha aparıldı" [8, 236]. Bu məlumatda guya qoca, uşaq və gənclərin öldürülməsindən Osman paşanın xəbərinin olmaması göstərilir. Halbuki artıq Səfəvi-Osmanlı müharibələri 1578-ci ildən yenidən başlayanda III Murad (1574-1595) "dinsiz Qızılbaş" olaraq adlandırdığı Səfəvilər dövlətinin əhalisinin qılıncdan keçrilməsi ilə bağlı fərmanlar vermişdir. Məsələn, Kürd bəylərinə göndərilən 61 saylı sənəddə yazılmışdır ki, "dinsiz tayfasının "İranlıların"(qızılbaşların – E.N.) qılıncdan keçirilməsi fərman olunmuşdur" [10, 59-60; 14, 64-65, 71-72]. Bu səbəbdən də Təbrizdə qalan əhalinin çoxunun da öldürülməsi, yalnız çox az bir qisminin əsir aparılması məlum olur. Osmanlıların Təbrizdəki qarnizonuna rəhbərlik edən

Cəfər paşa mərkəzə verdiyi 7 fevral 1586-ci il tarixli məlumatında şəhərin alınmasından keçən 5 ay müddətdə Təbrizdə 1500 nəfərin yaşamasını qeyd edirdi [19, 47]. Ümumiyyətlə Osmanlı ağalığı dövründə vergilərin ağırlığına görə əhali kütləvi şəkildə yaşadığı yeri tərk edərək də etirazını bildirirdi. Məsələn, dövrün müasiri Arakel Təbrizli yazır ki, "Dizaqın 4 kəndinin əhalisi yurdunu tərk edərək Persiyaya yollandı... Akulis (Əylis – E.N.) yaxınlığında Qoxta havarında (vilayətinin – E.N.) yerləşən, Dəşt adlanan yerin əhalisinin üçüncü hissəsi Persiyada məskunlaşdı" [17, 47]. Arakel bu məskunlaşmanın səbəbini "ağır vergilər, qarət, dağıntılar, zorakılıq və xristianların amansızcasına məhv edilməsi ilə" [17, 47] əlaqələndirir. Ə. Rəhmaniyə görə, bu mənzərə XVI əsrin sonu XVII əsrin əvvəllərində bütün Cənubi Qafqaz üçün xarakterik idi. Dinc əhali Kəfə, İstanbul, Misir bazarlarında qul kimi satılırdı. Hadisələrin bir başqa şahidi olan Məcduddin Məhəmməd Məcdiyə istinadən Ə. Rəhmani Təbriz əhalisinin Osmanlı zamanında vəziyyətindən bəhs edərkən qeyd edir ki, əhalinin bir hissəsi şəhərin işğalı zamanı məhv edilmiş, bir hissəsi əsir olaraq aparılmış, qalan hissəsi isə Əcəm İraqının şəhərlərinə səpələnmişdi [19, 43]. Təbrizlilər üçün Səfəvilər dövlətinin yeni paytaxtı İsfahanda xüsusi mənzil yeri-Abbasabad bina edilmişdir [19, 47]. Təbrizlə yanaşı Səfəvilər dövlətinin başqa şəhərləri də məcburi köçlərə məruz qalmışdır. XVI əsrin sonunda Osmanlı işğalı zamanı Şirvan və Qarabağın müsəlman, yəhudi və xristian əhalisi də Səfəvilərin nüfuz dairəsində olmuş Kaxetiya hökmdarı II Aleksandra pənah aparmış, sonradan da Şah I Abbas onları Mazandaranda yerləşdirmişdi. Xoy, Salmas və Urmiya əhalisi də doğma torpaqlarını tərk etməyə məcbur qalmışdır [19, 47]. Lakin bu zaman da köçən əhalinin sayı ilə bağlı hər hansı bir məlumat yoxdur.

Hərbi əməliyyatlarla əlaqədar miqrasiyalar Şah Abbasın dövründə də davam etmişdir. XVII əsrin əvvəllərində Osmanlılarla hərbi əməliyyatlar yeniləndikdə Səfəvilər Osmanlılara qarşı ilk öncə ənənəvi "yandırılmış torpaq" siyasətini həyata keçirdilər. Şahın fərmanına əsasən, Araz çayının sol sahili məntəqələri boşaldılmalı, əhalisi köçürülməli, bütün əhali köçürülməli, daşına bilən hər şey götürülməli, qalan hissəsi isə məhv edilib yandırılmalı idi [19, 68]. Ə.Rəhmani yazır ki, şahın fərmanı ilə 10 minlərlə sakin köçürüldü [19, 69]. Lakin köçürülənlərin dəqiq sayı bəlli deyil. Ərazi baxımdan ilk öncə Qars vilayətinə göndərilən qoşunlar həmin ərazini boşaltdılar. Daha sonra bu proses Qars və Ərzurum arasında yerləşən Həsən qalasına qədər davam etdi. Şahın fərmanına görə, istər xristian olsun, istəsə də müsəlman həmin torpaqlarda bir nəfər də olsun canlı qalmamalı və köçürülən sakinlər hara qədər gedə bilərlərsə oralarda da məskunlaşdırılmalı idi [19, 69]. Bu hadisə Səfəvilər tarixində "Böyük Sürgün" adlandırılır. Sürgünlərə İrəvan hakimi Əmirgünə xan, Naxçıvan hakimi Maqsud-Sultan Kəngərli kimi səlahiyyətli şəxslər təyin edilmişdi. İrəvan hakimi sürgünə gedənləri Arazdan cənuba-Qaradağa

yönləndirirdi. Naxçıvan hakimi isə ona tabe vilayətlərin əhalisini köçürmək tapşırığı almışdı. Culfa əhalisinin köçürülməsi isə şahın qulamı olan Təhmasibqulu bəyə həvalə edilmişdi. Əhalinin köçürülməsi və məntəqələrin dağıdılması barədə Şah I Abbasın əmri dərhal icra olunurdu. Şahın fərmanının verilməsindən bir neçə gün keçəndən sonra geridə dayanılacaq bir yer belə qalmamışdı. Naxçıvana kimi bütün yaşayış məntəqələri dağıntılar içində idi. Beləliklə, Naxçıvan, İrəvan, Culfa və digər şəhərləri ilə çiçəklənən diyar yandırılmış və boş torpaqlara çevrildi [19, 69]. Eyni fərman Salmasdan Təbrizə qədər olan ərazilərdə də icra olundu. Salmasdan Təbrizə qədər olan 40 fərsəxlik (250 km-lik) məsafədə bir adam belə bir gün dayana bilməzdi [19, 71].

Qəsri-Şirin sülhünə qədər əhali yerdəyişmələri davam etdi. Belə ki, 1617-ci ildə Krım xanı Canıbəy Gəray əsgərləri ilə Kəfədən Trabzona keçərək dərhal Gəncə, Naxçıvan və Culfa tərəflərini talan etmək üçün Osmanlı vəziri-əzəmi Xəlil paşadan izn istəmiş və icazə aldıqdan sonra sadalanan yerlərə axınlar edib 30.000-ə qədər əsirlə geri dönmüşdü [13, 108-109]. Həmin ildə Təbriz yenidən yandırılmış torpaq taktikasının qurbanı olmuşdu [6, 71]. Hələ 1617-ci ildə Təbrizdə olmuş ispan səfir Qarsiya de Silvaya istinadən S.Onullahinin yazdığı kimi "bir vaxtlar gözəl və yaxşı şəhər olan Təbriz indi xarabalığa çevrilmişdir" [19, 151]. Təbrizlə yanaşı Ərdəbil şəhərinin əhalisi də evakuasiyaya məruz qalmışdır, lakin bu bir dəfə baş vermişdir. 1618-ci ildə şəhərin köçürülməsi və yandırılması barədə qərar verilsə də icra olunmamışdır. Səbəb isə Osmanlıların Sərab ətrafında Səfəvilər tərəfindən məğlub edilməsi idi [19, 165].

**İqtisadi səbəbdən baş verən köçlər.** İqtisadi səbəbdən də müvəqqəti və daimi köçlər baş verirdi. Xüsusilə də gələn xarici qonaqlara, o cümlədən də dövlət nümayəndələrinə görə əhali üzərinə qoyulan öhdəliklər müvəqqəti köçlərə səbəb olurdu. Hər bir əyana, həm şəhərlilərin, həm də kəndlilərin evində qonaqlamaq hüququ vardı. Könəlgə adlanan bu hüquqa görə, onu qonaq saxlayan şəxsin üzərinə həm ona, həm də onun yük və minik heyvanına baxmaq öhdəliyi düşürdü. Könəlgə Şah I İsmayılın 1503-1506-cı il, Şah I Təhmasibin 1570-ci il, Şah I Abbasın 1604-cü il fərmanlarında da xatırlanır. Bu hüquq xüsusilə xarici qonaqlar gələrkən rəiyyətə daha baha başa gəlirdi. Adam Oleari Ərdəbilin hüdudlarına daxil olarkən Qolştiniyalıların Ərdəbil xanlarının mehmandarı tərəfindən qarşılandığını təsvir edərək yazırdı ki, "Bizə gediş və yük üçün 40 dəvə və 300-ə qədər at verdilər... Daşımaq üçün artıq vasitələrdən savayı biz kifayət qədər azuqə aldıq: gündəlik 10 qoyun, 30 batman şərab, düyü, yağ, yumurta, üzüm, badam və s. məhsullar" [18, 398]. Bütün bular yerli əhali hesabına təmin olunurdu ki, bəzən bu xərclərdən xilas olmaq üçün kəndli evini tərk edərək dağlara gedirdi və yalnız "təhlükə sovuşandan sonra" dönürdü. Oleari yazır ki, gecəni "Şahmurad kəndində qalanda bütün evlər boş idi: Ərəbanın (Şirvan hakiminin) adamları bizdən öncə şaha hədiyyələr apararkən haqqımızda yalnış xəbərlər yaymışdılar ki, guya biz hara gediriksə oranı qarət

edirik, boşaldırıq" [18, 399]. Əslində isə məsələ başqa idi. Ərəbxanı könəlgə edən kənd daha bir qonağı qəbul edəcək qüvvədə deyildi. İqtisadi səbəbdən edilən daimi köçlərə isə örnək olaraq Culfa əhalisinin köçürülməsini, onların üçün İsfahan ətrafında Yeni Culfa koloniyasının salınmasını qeyd edə bilərik.

Culfanın erməni əhalisinin köçürülməsi məsələsinə gədikdə isə İranda pəhləvilərin şahlığı dövründə təhsil nazirinin müşaviri qismində çalışmış Villiam Haas göstərir ki: "Şah I Abbasın erməni əhalini İsfahana köçürməsinə səbəb iqtisadi motiv idi: o, yeni seçdiyi paytaxtın tərəqqisinə ticarəti genişləndirməklə nail olmaq istəyirdi" [22, 190]. Ümumiyyətlə, Culfa tacirlərinin rolunu yüksək qiymətləndirən Şah I Abbas başa düşürdü ki, bu şəhər 1590-cı il müqaviləsinə əsasən Osmanlı imperiyasının nəzarəti altına keçdikdən sonra Culfa tacirlərindən öz məqsədlərini həyata keçirmək üçün istifadə edə bilməyəcəkdir. Dövlətin iqtisadi və siyasi maraqlarını üstün tutan Şah I Abbas osmanlıların gəlişinə qədər Culfa sakinlərinin köçürülməsinə qərar verdi, onları İsfahan yaxınlığında yerləşdirdi. Bununla da həm mühüm ticarət sərmayəsinin toplandığı bir mərkəzin osmanlıların əlinə keçməsinə mane oldu, həm də orada yaşayan və beynəlxalq ticarət rolu olan "ermənilərdən" (həmin "erməniləri" müasir ermənilərlə eyniləşdirmək düzgün deyil – E.N.) istifadə etdi. Sənədlərə "erməni" kimi düşmüş bu tacirlər alban əsilli xristianlar idilər. Qərb tacirləri xristian olduqlarına görə albanlara da "erməni" deyirdilər [4, 227].

**Hərbi dayaq yaratmaq və cəzalandırmaq məqsədi ilə edilən köçlər.** Bu növ köçlər həm hərbi dayaq yaratmaq, həm də bəzi tayfaların nüfuzunu zəiflətmək üçün həyata keçirilmişdir. Şah I İsmayıl türk-qızılbaş tayfalarından Ustacluları Əcəm İraqında, Kirmanda, Şamlıları Xorasanda, Təkəliləri İsfahanda, Həmədan və Əcəm İraqında, Zülqədərləri Farsda, Türkmanları (Mosulluları) Bağdadda yerləşdirərək fəth olunmuş bölgələrdə davamlı dayaqlar yaratmışdı. Adlarını qeyd etdiyimiz türk tayfalarının rəislərinə də bu vilayətlərdə tiyul və vəzifələr verilmişdi [1, 35]. Şah I Təhmasib tərəfindən Bayat elinin obasının müəyyən hissəsi Astrabada köçürülüb yerləşdirildi [1, 39]. Bu yerləşməyə qədər bu elin bəzi obaları Şah I İsmayıl dövründə Dərbənd və Şabran ətrafında məskunlaşdırılmışdı. Şah II İsmayıl (1576-1577) da fəth olunmuş bölgələrdə yerli dayaqların möhkəmləndirilməsinə ciddi fikir vermişdi. O, Ustaclılardan xeyli əhalini Sistanda yerləşdirib, İbrahim Sultan Ustaclını bura hakim göndərdi. Təkəlilərin bir qismini Reydə yerləşdirib, bura Şərafəddin oğlu Museyib xanı, Qum və Savəyə Türkmanlardan köçürüb, buraya isə Əmir xan Mosullunu hakim təyin etmişdi. Murtuzaqulu xanı isə Məşhədə vali təyin edərək xeyli Türkman əhalini də bu bölgəyə köçürüb yerləşdirmişdi [1, 40]. Şah I Abbas da ata-babalarının ənənəvi daxili siyasət kursuna etinasız qalmadı. Belə ki, o, imperatorluğun cənub-şərqində yerli dayaqlarını möhkəmləndirmək üçün Şirvandan bir çox oymaqlar köçürüb bu bölgələrdə

yerləşdirdi. Eyni zamanda, Qarabağdakı Otuz iki, Qazaxlar, Şəmsəddinli oymaqlarından xeyli əhali Mazandaran və Farsa köçürülmüşdü. Şərqi Anadoludan 1612-ci ildə Azərbaycana köçən Silsüpürlərdən 2000-ə qədər ailə Savə, Rey və Firuzguh tərəfdə yerləşdirildi [1, 43; 18, 154]. Bunlar Osmanlıda geniş miqyasda qarət və talanlar törətdiklərinə görə, onlar Silsüpür adlandırılmışdı. Şah Abbas onları bir neçə bölüyə ayıraraq Savə, Rey, Huvar və Firuzkuh tərəflərinə göndərdi [15, 154]. Bundan başqa Osmanlı işğalı vaxtı onun xidmətinə girən Qaracadağlılardan və Qarabağlılardan bir çoxunu cəzalandırdı. Osmanlı hakimiyyət və xidmətində qalan Otuz İki, Qazaxlar və Şəmsəddinlü oymaqlarına dönük adı verildi. Bunların bir qismi yerli müsəlman, qeyri-müsəlman Qarabağ və Şirvan xalqı ilə birlikdə Mazandarandakı Fərahabadda yerləşdirildi. (1612) Bunların sayı 15.000 evə yaxın idi [15, 153-154]. Ərzurum-Pasin arasında yaşayan Müqəddəm oymağı da Qızılbaş ölkəsinə köç edərək Marağa tərəflərdə yerləşdirildi. Bu köçlərdən digər biri də Bəydili boyuna mənsub olan Gündoğmuşun Bağdad səfəri əsnasında (1623-cü ildə) başçılıq etdiyi oymağı ilə Şahsevən olaraq Şah I Abbasın xidmətinə daxil olması idi. Onlar Azərbaycanda müəyyən ərazilərə sahib oldular. Şah Abbas zamanında Anadoludan Səfəvilər dövlətinə başqa köç dalğası da oldu. Hətta Bəydili oymağının rəhbəri Firuz bəyin "bu cür pis yerlərdə yaşanmaz" deyərək Qızılbaş ölkəsinə getməsinə dair bir mənzumə dövrümüzə qədər gəlib çatmışdır. 1608-1609-cu illərdə çoxsaylı Cəlali kütləsi də Qızılbaş ölkəsinə gəldi. Sayları 13.605 nəfər idi. Cəlaliləri kürdlərə qarşı istifadə etmək məqsədilə Urmiya və Səlmas tərəflərə köçürdülər. Lakin osmanlı hökuməti tərəfindən Cəlali başçılarının ən ümdə olanlarına gələn əfvnamələr sonrasında bir qismi Diyarbəkirə geri döndü. Cəlalilərdən şahın xidmətində yalnız 500 nəfər qalmışdı [15, 154-155]. Cəlalilərlə yanaşı Şah Abbas tərəfindən Əfşarlar da Urmiyada məskunlaşdırılmışdı. Bu barədə N.Kondo Mirzə rəşid Ədib əl-Şüəranın müəllifi olduğu "Tarixi Əfşar" adlı mənbəyə istinadən məlumat verir. O, yazır ki, "Əfşarlar Səfəvilərin erkən dövründə qorçubaşı və Kirman hakim kimi yüksək vəzifələri tuturdular. Lakin Şah Abbasın hakimiyyəti dövründə onlar təsisat islahatları nəticəsi kimi tədricən bu vəzifələrdən uzaqlaşdırıldılar. "Tarixi Əfşar" adlı mənbəyə görə Əfşarlar hicri tarixi ilə 1035-ci, yəni 1625-ci ildə Urmiyaya köçürüldü" [26, 539]. Osmanlı qoşunlarına qarşı Bağdadın müdafiəsində Əfşarların rəhbəri Kəlbəli Sultanın göstərdiyi xidmətlər qarşılığında Urmiya vilayəti iqta olaraq ona bağışlandı və xan titulu ilə təltif edildi. Bu səbəbdən də 8000 Əfşar ailəsi (təxminən 400.000 nəfər) İraqi Əcəm, Fars, Kirman və Xorasandan Urmiyaya köç etdi. Əslində bu köç də Osmanlıyla sərhəddə yerləşən Urmiyada dayaq yaratmaq və əfşarlardan kürdlərə qarşı istifadə etmək idi [26, 539]. Qacar tarixçilərindən Rzaqulu xan Hidayətə istinadən Con Perri İranda məcburi miqrasiyaya həsr etdiyi əsərində Qacarların Şah I Abbas tərəfindən köçürülməsi məsələsinə qeyd edir. Tədqiqatçı yazır ki,

"Qarabağ, Gəncə, Xorasan, Mərv və Astrabad əyalətləri Qacarların Ziyadlu və Qovanlu adlanan iki böyük qolu tərəfindən idarə olunurdu. Görünür, nüfuzları Şah I Abbası narahat etdiyinə görə onları zərərsizləşdirmək məqsədi ilə 3 qola ayırdı. Onların bir hissəsini Xorasanın Mərv ərazisinə göndərdi; bir başqa hissəsi Qarabağda qaldı; üçüncü hissəsini isə Astrabadda Gürgan çayının sahilində məskunlaşdırdı" [28, 205-206]. Gəncə ətrafından Xorasanın Mərv nahiyəsi və Astarabadın Mübarəkabad qalası ətrafına köçürülənlərin sayı 30.000 nəfər idi [28, 206]. Bu köçün əsas məqsədini sadəcə Şah I Abbasın qacarları zəiflətmək istəyi kimi təqdim etmək doğru olmazdı. Əks halda şah dövlətin özbək və çərkəzlərə qarşı sərhədlərini onlarla möhkəmləndirməzdi. Şah I Abbas dövründə 1616-cı ildə Kaxetiyaya edilən cəza yürüşü vaxtı 100.000-dən çox gürcü uşaq və qadının əsir alınaraq [25, 1113] müsəlmanlaşdırılmaq üçün bütün ölkə boyu səpələnməsi barədə İsgəndər bəy Münşi məlumat verirdi. Isfahan-Şiraz yolunu kürdlərin hücumlarından qorumaq üçün gürcülərlə çərkəzlər də Kəşki-Zare və Meynədə yanaşı məskunlaşdırılmışdı [24, 254]. Şah II Abbas (1642-1664) zamanında da bu köçlər davam etdi. 1658-ci ilə Azərbaycan və Qarabağın elat əhalisinin bir qisminin Kaxetiyaya köçürülməsi haqqında göstəriş verildi. Şahın göstərişinə əsasən 15.000 elat əhalisi həmin əraziyə köçürülüb və burada dövlət hakimiyyəti üçün davamlı dayaqlar yaradılmışdır. Mənbədə köçürülən elat əhalisinin xeyli hissəsinin qala və şəhərlərdə yerləşdirildiyi göstərilmişdir. Şah onlara Kaxetiyanı abadlaşdırmağı da tapşırmışdı [5, 34; 1, 43]. Şah Süleymanın (1666-1694) hakimiyyəti dövründə 1668-ci il sentyabr tarixli fərmanında Şirvanda Şahsevən, Əfşar, Şamlı qorçularının yerləşdiyi qeyd olunur. Bu fakt Qızılbaş tayfa qorçularının müəyyən hissəsinin sərhəd vilayətlərində yerləşdirilməsi və bu vilayətlərin qorunmasının onlara tapşırılmasını göstərir [1, 147]. Çox az hallarda bu cür məqsədilə köçürülənlər geri qayıdırdı. Belə az təsadüf edilən hallardan biri Şah I Abbas zamanında baş vermişdir. XVII əsrin əvvəllərində İrəvan qalası Əmirgünə xan tərəfindən təmir edilərkən bir vaxtlar buradan köçürülənləri Azərbaycanın el, ulus və pərakəndə halda olan tərəkəmələri içərisindən toplayıb yenidən İrəvana gətirdi. İraqi Əcəmdən Şah I Abbasın əmri ilə Qacarın Ağcaqoyunlu oymağı, Musaoğlu, Səbat elinin hamısı gətirilib İrəvan və Şərurda yerləşdirildi. Yenidən buranın Qızılbaş elləri öz qədim yurdlarına qayıtdılar [1, 217]. Dayaq yaratmaq məqsədilə köçlər bir müddət Səfəvi taxtını ələ keçirən əfqanlar tərəfindən də həyata keçirilmişdir. Lakin, əfqanların yerləşdirmə siyasəti bir qədər fərqli formada aparılmışdır. Gilzay tayfalarına rəhbərlik edən Mir Mahmud xan tərəfindən 1722-ci ilin oktyabrında İsfahan ələ keçirilərkən özünü şah elan edən Mahmud xan paytaxtı inam bəsləmədiyi əhalidən tez bir zamanda təmizləmək istəyirdi. Bu məqsədlə Həmədandan sünni Dərgəzin tayfasından olan 4000 ailə, əfqan generalı Nəsrullah tərəfindən İsfahana köçürdülüb yerləşdirilir, mərkəzi tərk etmək

istəyənlərə isə bunu etmək üçün icazə verir və nəticədə, xeyli sayda isfahanlı şəhəri tərk edir. Bu köçənlərin sayı ilə bağlı dəqiq məlumat yoxdur [2, 138].Səfəvilər dövlətində son köçlər Nadir xanın adı ilə bağlıdır. Nadir xan özünü şah elan edənə qədər hərbi dayaq yaratmaq məqsədi ilə müxtəlif tayfalardan Xorasana əhali köçürdü. Mirzə Mehdi xan Astrabadinin "Tarixi-Cahanguşayi-Nadiri" əsərinə görə, "hicri 1141-ci ildə (1728) O, Abdali tayfalarının ilk dəstəsini Heratdan Xorasana-Cəm,Ləngər və Məşhədə göndərdi" [29, 95]. Nadir xan Azərbaycanı tərk etməzdən əvvəl öz tayfasından olan 50.000, yaxud 60.000 ailəyə (təxminən 300.000 nəfərə) bu əyalətdən və Səfəvi İraqından, Farsdan Xorasana köçməyi əmr etdi. Onların arasında 12.000 Əfşar ailəsi (Qırxlı qolundan 2000 ailə də daxil olmaqla təxminən 60.000 nəfər) vardı, bu Qırxlılar Kubkan ətrafındakı rayonlara, qalan Əfşarlar isə Kelata göndərildi [27, 51-52]. Mirzə Məhəmməd Astrabadiyə görə, Qırxlı tayfası ilə yanaşı Türkman, Müqəddəm, Kürd və Bəxtiyarı tayfalarından olanlar da köç etdi [29, 134-135]. Con Perrinin sözlərinə görə, "öz növbəsində onlara Böyük Azərbaycanın müxtəlif hissələrindən 1735-ci ildə Ziyadoğlu Qacarları, 6000 Şəqqaqi kürdü (30.000 nəfər), Tiflis şəhərindən 6000 gürcü (30.000 nəfər) və 12.000 (60.000 nəfər) türk ailəsi qoşuldu" [28, 209].

**Başqa dövlət tərəfindən hərbi dayaq yaratmaq məqsədi ilə reallaşdırılan köçlər.** Əhali yerləşdirilmələrinin bir başqa forması xarici dövlətlər tərəfindən Səfəvilər dövlətinin hüdudlarına edilən köçlər idi ki, bu baxımdan Ümumrusiya imperiyasının 1724-cü ildən etibarən Bakı və onun ətraf ərazilərinə gəmiqayırmada və digər işlərdə istifadə olunmaq üçün 5 min Kazan tatarı, çeremis və çuvaşı məskunlaşdırmasını qeyd edə bilərik. Lakin onların bir hissəsi artıq 1728-ci ildə geri döndü. Bir qismi isə işləmək üçün burada qaldı [16, 68-69, 141]. Gedənlərin və qalanların sayı ilə bağlı dəqiq məlumat yoxdur. İmperator I Pyotrun (1721-1725) siyasətinə müvafiq olaraq, Bakı və onun ətraf ərazilərində xristianlar, başlıca olaraq, ermənilərlə məskunlaşdırılırdı. I Pyotr 1724-cü il noyabrın 10-da, ölümündən bir az əvvəl erməni xalqının "ermənilərə himayədarlıq göstərilməsini və onların Xəzəryanı əyalətlərdə məskunlaşmasına icazə verilməsini iltimas edən" dörd nümayəndəsini qəbul etmişdi. Elə həmin gün, yəni, 1724-cü il noyabrın 10-da 1 Pyotr erməni patriarxı İsaya və bütün erməni xalqına ermənilərin Gilanda, Mazandaranda və Bakıda məskunlaşmasına icazə verilməsi barədə fərman vermişdi. 10 noyabr 1724-cü il tarixli fərmanda general-leytenant Matyuşkinə və briqadir Levaşova "ermənilərin Gilanda, Mazandaranda, Bakıda, Dərbənddə və s. yerlərdə məskunlaşmasına hər cür yardım göstərmək, hətta, lazım gəlsə farsları sıxışdırmaq" tapşırılırdı [21, 392-397]. Burada Ezovun qeyd etdiyi farslar adı dövlətin etnik tərkibinə fərq qoyulmadan ümumi əhalinin adlandırılması kimi qəbul edilmişdir ki, bu da yalnışdır. Ezov daha sonra qeyd edir ki, "General-leytenant Matyuşkinə və briqadir Levaşova da əmr edilmiş və bütün erməni

xalqına da elan olunmuşdu ki, ermənilləri və digər xristianları hər vəchlə rus qoşunlarının tutduqları Persiya əyalətlərinə - Gilana, Mazandarana, Bakıya, Dərbəndə və başqa əlverişli yerlərə köçməyə çağırsınlar, nəvazişlə qəbul edib, hər cür mərhəmət göstərsinlər, onlara layiqli yerlərdə yaşamaq üçün torpaq ayırsınlar, şəhər və kəndlərdəki boş həyətləri və ev əşyaları onlara versinlər, eləcə də müqavimət göstərmiş, yaxud bunda şübhələnilən müsəlmanlar qovulsun, onların yerlərini isə həmin xristianlar tutsunlar" [21, 396-397]. Həmin müəllif həmçinin xəbər verir ki, hökmdar I Pyotrun əsas arzularından biri ələ keçirilmiş əyalətlərdə xristianların sayının artırılması idi. 1725-ci il fevralın 11-də artıq I Pyotrun ölümündən sonra Xarici işlər nazirliyinin kollegiyası ermənilər haqqında Matyuşkinə verilmiş 10 noyabr 1724-cü il tarixli ali sərəncamı təsdiq edən fərman verdi. Sonralar belə bir fərman 1726-cı il fevralın 22-də I Yekaterina tərəfindən də verilmişdir [21, 431]. Beləliklə, ermənilərin Bakıda, eləcə də digər Xəzəryanı ərazilərdə məskunlaşması, başlıca olaraq, bu vaxta aiddir. Bu köçürülmələrə XVIII əsrin 20-ci illərində Səfəvilərin daha geniş ərazilərini işğal edən Osmanlıların münasibətinə gəldikdə isə fərmanlarda maraqlı bir məqama toxunulur. Məsələn, Osmanlılarla Səfəvi torpaqlarını bölüşdürməklə bağlı danışıqlar getdiyi vaxtda imperator I Pyotrun İstanbula göndərilən A.M.Rumyantsevə göndərdiyi yeni fərmanında bildirilirdi ki, "Erməni nümayəndələri gəlib onları zalımlardan xilas etməyi xahiş edirlər. Əgər biz bunu etmək iqtidarında deyiliksə, heç olmazsa onları tutduğumuz ərazilərə köçürməliyik. Türklər bu barədə soruşsalar bildirin ki, biz onlardan xahiş etməmişik, özləri istəyiblər... Həm də türklər özləri bunu istəyəcəklər, belə ki öz ərazilərində onlara qarşı müxalif qüvvə olmayacaqdır. Əgər Osmanlılar bunun əvəzində müsəlmanların onların ərazilərinə köçürülməsini tələb etsələr etiraz etməyin" [20, 163-202]. Lakin bu köçürmə siyasəti həmin dövrdə baş tutmadı. 1732-1735-ci illərdə Rusiya zəbt etdiyi Xəzərsahili vilayətləri Səfəvilər dövlətinə geri qaytarmalı oldu.

Tədqiq etdiyimiz köçlərin demək olar ki, hamısı mütəşəkkil, yəni dövlətin iştirakı ilə baş vermişdir. Bu köçlərlə yanaşı Səfəvilər dövlətində fərdi miqrasiyalar da qeydə alınıb. Fərdi köçlərin müxtəlif istiqamətlərdə və müxtəlif səbəblərdən geniş miqyasda baş verə biləcəyi ehtimal edilə bilər. Lakin mövcud araşdırmaların kifayət qədər məhdud olması problemi bütövlükdə nəzərdən keçirməyi çətinləşdirir. Bu problemin bəzi məqamları ilə bağlı Masaşi Hanedanın müəllifi olduğu "XVI-XVIII əsrlər ərzində iranlı elitaların Hindistana emiqrasiyası" adlı məqaləsini xüsusi olaraq qeyd etmək lazımdır. Məqalədə Səfəvilər dövlətindən Moğol dövlətinə mühacirət etmiş adlı-sanlı nəsillərdən olan emiqrantlar barədə məlumat verilir. Tədqiqatçı bu şəxslərin Səfəvilər dövlətinin hansı ərazilərindən köç etmələrini, etnik mənsubiyyət və saylarını tədqiq edərək cədvəl formasında təqdim etmişdir [23, 129-143]. Müəllif mənbə kimi 1780-ci ildə yazılıb başa çatdırılan Nəvvab Şəms əd-Dövlə

Şah Nəvaz xanın "Məaser əl-ümara" adlı əsərinə istinad edir. Kəlküttədə 3 cilddə nəşr olunan bu əsər 1556-cı ildən 1780-ci ilə qədər 738 görkəmli şəxsin tərcümeyi-halını özündə əks etdirir [30]. Mənbədə hər şəxs barədə ayrıca məlumat vermək prinsipi hər zaman gözlənilmir. Bəzi hallarda bir tərcümeyi-halda iki şəxs barədə eyni anda məlumat verilir [23, 139]. M.Hanedanın tədqiqatlarından məlum olur ki, iki əsr ərzində Səfəvilər dövlətindən emiqrasiya edən 198 nəfəri 3 qrupda cəmləşdirmək olar. Birinci qrupa daxil edilən, köç edənlərin əksəriyyəti-165 nəfəri mənşəcə tacik idi. Onlardan 113-ü dövlətin şərq, 49-u mərkəzi və şimal, 3-ü qərb bölgəsindən Moğol dövlətinə köç etmişdi. Emiqrantların ikinci qrupu türklər idi. Taciklərdən fərqli olaraq tədqiqatçı onları daxil olduqları tayfalara görə qruplaşdırır: 2 Əfşar, 2 Zülqədər, 3 Qaramanlu, 5 Qara-Qoyunlu, 2 Ustaclı tayfasından olan cəmi 14 nəfər türk. Köç edən 19 nəfərin isə hansı tayfadan olmasını müəyyənləşdirə bilməyən M.Haneda digərləri adı ilə onları üçüncü qrupda təqdim edirdi [23, 133]. Sözsüz ki, "Məaser əl-ümara" adlı mənbəni əsas alaraq təqdim edilən Səfəvi elitasının Moğol dövlətinə istiqamətlənən emiqrant axının sayı son söz olaraq qəbul edilməməlidir. Bu baxımdan Səfəvilər dövrünə dair mənbələrin bütövlükdə təhlil edilməsi, əldə olunan nəticələrin ümumi formada nəzərdən keçirilməsi zəruridir.

Verilən məlumatlardan məlum olduğu kimi köç hadisəsi hansı formada və şəkildə olursa olsun hər zaman və məkanda oluduğu kimi Səfəvilər dövündə də istər mənfi, istərsə də müsbət baxımdan əhaliyə öz təsirini göstərmişdir. Bu bir çox şəhərlərin əhali sayının artıb-azalmasında, hansısa bir ərazinin iqtisadi baxımdan tənəzzül və inkişafında özünü biruzə vermişdir. Məsələn, Osmanlıların Təbrizdən İstanbula sənətkarlar aparması sonrakı dövrlərdə Təbrizin iqtisadi inkişafına mənfi təsir göstərmişdi. O, cümlədən də Təbriz başda olmaqla bir sıra Səfəvi şəhərlərinin Şah I Təhmasib və Şah I Abbasın həyata keçirdiyi yandırılmış torpaq siyasətinin qurbanına çevrilməsi, insanların müxtəlif ərazilərə səpələnməsinə, bəzi bölgələrin dağıdıldıqdan sonra tamamilə tənəzzülünə səbəb olmuşdu. Xüsusilə də Osmanlılarla sərhəddə yerləşən Culfa şəhərinin aqibəti buna örnək ola bilər. Köçürülmələrin müsbət cəhəti isə Səfəvilər dövlətinin hərbi dayaqlar yaratmaq üçün qızılbaş tayfalarını müxtəlif bölgələrdə yerləşdirilməsi idi. Bu yolla dövlət varlığını iki əsrdən çox bir müddət ərzində qoruyub saxlamağı bacarmışdı. Digər tərəfdən də Culfa əhalisinin İsfahan ətrafına köçürülməsi bütövlükdə Şah I Abbasın dövlətin iqtisadi həyatının canlandırılması üçün həyata keçirdiyi ən mütərəqqi tədbir hesab edilə bilər. Lakin, XVII əsrin sonlarından başlayaraq ticarətin inkişafı məqsədilə köçürülən xristian tacirlərin dövləti böhrana doğru aparması və son nəticədə də bu dövlətin süqutunu tezləşdirən amillərdən biri olması məlum olur.

## ƏDƏBİYYAT


1. *Bayramlı Z.H.* Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu. Bakı: Avropa, 2015, 348 s.
2. *Dadaşova R.İ.* Səfəvilərin son dövrü (ingilisdilli tarixşünaslıqda). Bakı: Nurlan, 2003, 440 s.
3. *Əfəndiyev O.Ə.* Azərbaycan Səfəvilər dövləti. Bakı: Şərq-qərb, 2007, 344 s+8 s.
4. *Əzimli D.* Azərbaycanın Qərbi Avropa ölkələri ilə ticarət əlaqələri və Türkiyə (XV əsrin II yarısı-XVII əsrin I yarısı). Bakı: Turxan NPB, 2014, 292 s.
5. *Həsənəliyev Z.M., Bayramlı Z.H.* II Şah Abbasın hakimiyyəti illərində Azərbaycan Səfəvi dövlətinin daxili və xarici siyasəti. Bakı: Elm, 2011, 88 s.
6. *İsgəndər bəy Münşi Türkman*. Tarix-i aləmara-yi Abbasi (Abbasın dünyanı bəzəyən tarixi). I Cild. Fars dilindən tərcümənin, ön sözün, şərhlərin və göstəricilərin müəllifləri Əfəndiyev Oqtay Əfəndiyev və Namiq Musalı. Bakı: Şərq-Qərb Nəşriyyat evi, 2009, 792 s. (elektron variant)
7. *Nəciyev E.R.* Təbriz sürgünləri // Tarix və onun problemləri, 2015, № 4, s.82-89.
8. *Onullahi S.M.* XIII-XVII əsrlərdə Təbriz şəhəri (sosial-iqtisadi tarixi). Bakı: Elm, 1982, 280 s.
9. *Arslan H.* 16 yy. Osmanlı toplumunda yönetim, nüfus, iskan, göç ve sürgün. İstanbul: Kaknüs yayınları, 2001, 431 s.
10. *Canpolat C.* Osmanlı Belgelerinde aleviler hakkında idam ve sürgün fermanları. İstanbul: Markiz yayınları, 2012, 192 s.
11. *Hoca Sadettin Efendi*. Tacü't-tevarih 5 ciltte (Hzr. İsmet Parmaksızoğlu). IV cilt: Şehzadelerin Girişimleri - Selimname ve Yavuz Sultan Selim Dönemi. Ankara: Kültür Bakanlığı Yayınları, 1979, 408 s.
12. *İdrîs-i Bidlîsî.* Selim Şah-nâme (haz. Dr. Hicabi Kırlangıç). Ankara: Kültür Bakanlığı Yayınları, 2001, 432 s.
13. *Küpeli Ö.* Osmanlı-Safevi münasebetleri (1612-1639). İstanbul: Yeditepe yayın evi, 2014, 336 s.
14. *Öz B.* Aleviler ile ilgili Osmanlı belgeleri. İstanbul: Can yayınları, 2014, 302 s.
15. *Sümer F.* Safevi devletinin kuruluşu ve gelişmesinde Anadolu türklerinin rolü. Ankara: Güven Matbaası, 1976, 265 s.
16. *Бутков П.Г.* Материалы для новой истории Кавказа с 1722 по 1803 г. [в 3 ч.] част первая. СПб.: Имп. Акад. Наук, 1869, 649 с.
17. *Даврижеци А.* Книга историй. Перевод с армянского предисловие и комментарий Л.А.Ханларяна. М.: Наука 1973, 624 с.
18. *Олеарий Адам.* Описание путешествия в Московию. Перевод с немецкого А.М. Ловягина. Смоленск: Русич, 2003, 480 с.
19. *Рахмани А.А.* Азербайджан в конце XVI и в XVII веке (1590-1700 годы). Баку: Элм, 1981, 238 с.
20. *Соловьев С.М.* Петр Великий на Каспийском море // Вестник Европы,1868, № 3, с. 163-202
21. *Эзов Г.А.* Сношения Петра Великого с армянским народом. СПб: типография Императорской Академии Наук, 1898, 512 с.
22. *Haas W. S.* Iran. New York: Columbia University press, 1946, 273 p.

23. *Haneda M.* Emigration of Iranian Elites to India during the 16-18th centuries // Cahiers d'Asie centrale, 1997, № 3-4, p. 129-143
24. *Hirotake M.* The Forced Migrations and Reorganisation of the Regional Order in the Caucasus by Safavid Iran: Preconditions and Developments Described by Fazli Khuzani // Reconstruction and Interaction of Slavic Eurasia and Its Neigh-boring Worlds' held by the Slavic Research Center, 2004, p.237-271
25. *History of Shah Abbas the Great (*Tārīk-e Ālamārā-ye 'Abbāsī*) by Eskandar Beg Monshi in two volume.* Translated by Roger M. Savory. Boulder, Colorado: Westwies Press, 1930, 1392 p.
26. *Kondo N.* Qizilbash Afterwards: The Afshars in Urmiya from the Seventeenth to the Nineteenth Century // Iranian Studies, 1999, vol. 32, № 4, p. 537-556
27. *Lockhart L.* Nadir Shah: A Critical Study Based Mainly Upon Contemporary sources, London: Luzac & CO, 1938, 370 p.
28. *Perry J.R.* Forced Migration in Iran during the Seventeenth and Eighteenth Centuries // Iranian Studies, 1975, vol. 8, № 4, p. 199-215
29. *Mirza Mahdi-khan Astarabadi.* Jahangusha-yi Nadiri, bi-ihtimām-i 'Abd Allāh Anvār. Tehran: Anjuman-i Āsār-i Millī, 1341[1962 və ya 1963], 860 s.
30. *Navvâb Şamşam al-Dawla Shâh Navâz Khân.* Ma'aser al-umarâ, edited for Society of Bengal by Mawlavî Mirza Ashraf and 'Ali Mawlavî Abd al-Rahîm, in 3 volume, Calcutta, 1888-1891